*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 73-77 (2015)*

# Abşeronda Meyvə Bağlarına Zərərverən Başlıca Qabıqyeyən Böcəklər (*Coleoptera, Ipidae*) və Onların Bioekoloji Xüsusiyyətləri

**K.B. İsayeva**

*AMEA Zoologiya İnstitutu, A.Abbaszadə küçəsi, məhəllə 504, kecid 1128, Bakı1073, Azərbaycan;*
*E-mail: nauka-205@mail.ru*

**Məqalədə Azərbaycanda qeydə alınmış 89 növ böcəkdən Abşeronda meyvə bağlarına zərərverən 5 növ qabıqyeyənin bioekoloji xüsusiyyətləri və təsərrüfat əhəmiyyətləri haqda məlumatlar verilir. Bu böcəklər Abşerondakı meyvə, üzüm və zeytun bağları üçün ciddi təhlükədir. Onlar nəinki zədələnmiş ağaclara, hətta sağlam ağaclara belə hücum edir. Ağacların gövdəsini zədələyir və bitkinin quruyaraq məhvinə səbəb olur.**

***Açar sözlər:*** *Coleoptera, Ipidae, qabıqyeyən, Abşeron, sürfə, pup*

## GİRİŞ

Müasir dövrün əsas problemlərindən biri ekoloji çirklənmələrin demək olar ki, maksimum həddə çatmasıdır. Digər tərəfdən isə dünyada əhali sıxlığı durmadan artır. Buna gorə də əhalinin ərzaq məhsulları ilə etibarlı təminatı, ərzaq məhsullarının ekoloji təmizliyi və təhlükəsizliyi dövrümüzün aktual problemlərindəndir.

Azərbaycan Respublikası Prezidentinin 2008-2015-ci illərdə Azərbaycanda əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına və ərzaq məhsullarının təhlükəsizliyinə dair "Dövlət proqramlarının həyata keçirilməsi sahəsində keyfiyyətli meyvə məhsulları yetişdirilməsi və yeni bağların yaradılması işləri günü-gündən genişlənir.

Azərbaycanda, o cümlədən Abşeron ərazisindəki meyvə bağlarında çox qiymətli yerli və introduksiya olunmuş meyvə ağacları becərilir. Bu meyvələrin əksəriyyəti həm də insanlar üçün müalicəvi əhəmiyyət kəsb edir. Buna görə də onların qorunmasına, bərpasına və məhsuldarlığının artırılmasına xüsusi diqqət yetirilir. Yüksək məhsuldarlıq əldə etmək üçün geniş tədbirlər planı hazırlanıb həyata keçirilir.

Abşeronda meyvə bağları və meyvəçilik təsərrüfatları hər il çoxlu sayda zərərverici həşaratlar tərəfindən ciddi ziyana məruz qalır. Bu zərərverici həşaratlar içərisində qabıqyeyən böcəklər (Coleoptera, İpidae) xüsusi yer tutur.

## MATERİAL VƏ METODLAR

Materialların toplanması və işlənməsi 2013-2014-cü illərdə çöl və laboratoriya şəraitində həyata keçirilmişdir.

Stasionar məntəqələr kimi Abşeron rayonunun Masazır qəsəbəsi (stasionar-1), Bakı kəndləri – Fatmeyi, Bülbülə, Hövsan (stasionar-2) və Hövsan qəsəbəsində "Zeytunluq" (stasionar-3) adlanan ərazi seçilmişdir (Şəkil 1).

Zərərvericilərin növ tərkibini və morfoloji əlamətlərini müəyyən etmək üçün MBS-1 və MBS-9 mikroskop-lupadan, "Biolam" mikroskopundan, "Canon" digital fotoaparatından, "İSO-901" markalı termostatdan, termometrdən istifadə edilmişdir.



**Şəkil 1**. Materialın toplandığı meyvə bağı (Masazır qəsəbəsi).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Qabıqyeyən böcəklər ağacla sıx bağlı olan böcəklərdir. Onların kiçik, silindr formalı bədəni və kiçik başı var. Ədəbiyyat məlumatlarına əsasən, keçmiş SSRİ-də 300 növü, Azərbaycanda isə 89 növü yayılmaqla, ağacların qabığı altında yaşayır və zərər verirlər. (Самедов, 1963) Azərbaycanda ağaclara ciddi zərərverən növlərdən 8 növün bioekoloji xüsusiyyətləri və təsərrüfat əhəmiyyəti öyrənilmişdir. (Məmmədov və b., 2014) Onların ağaclara vurduğu zərərin hesabına, ağaclar texniki və fizioloji cəhətdən zəifləyir və məhv olurlar. Sürfələrin inkişafı qabıqaltında və gövdə üzərində, bəzən də zoğ və kök hissələrdə gedir. Böcəklərin rəngi adətən şabalıdı, qara və bozdur. Bədən möhkəm

qanadüstlüyü ilə örtülüb ki, onun da altında yaxşı inkişaf etmiş qanadlar var. Onların köməyi ilə böcəklər uçurlar. Yumurtaları ağ və balacadır. Sürfələri ətli, ayaqsız, bir az əyilmiş, aydın görünən tünd rəngli baş hissədən ibarətdir. Tüksüz və ya az tüklüdür. Pupları ağ rəngdədir.

Qabıqyeyənlərin bədəninin quruluşu onların həyat tərzi ilə sıx əlaqədardır. Belə ki, onların həyat tərzi gizlin, ağacların qabığı altında keçir. Orada onlar müəyyən formalı yollar (izlər) qoyurlar. Hər bir növ qabıqyeyənin özünəməxsus sadə və mürəkkəb izləri olur. Sadə izlər bir kanaldan ibarət olur ki, bu da dişi böcək tərəfindən qoyulur. Onlar uzununa və eninə olurlar. Mürəkkəb izlərdə bir neçə kanal olur və onlar eninə və uzununa istiqamətli, ulduzvari və şüa formalı olurlar.

Xarici görünüşünə görə qabıqyeyənlər öz aralarında üç yerə bölünürlər: Lifyeyənlər, oduncaqyeyənlər və əsl qabıqyeyənlər. Lifyeyənlərin bədəninin arxa tərəfi bir çox böcəklərdə olduğu kimi qabarıq və yumrudur. Əsl qabıqyeyənlərdə bədənin arxa tərəfində dişciklərlə əhatə olunmuş çökəklik vardır ki, bu da səbəti və ya uşaq arabasını xatırladır. Dişciklərin forması hər bir növ üçün özünəməxsus və fərqlidir.

Qabıqyeyənlərin fəaliyyəti adətətən yazda başlayır və yayın ortalarına qədər davam edir. İlk olaraq aprel ayının axırlarında küknar lifyeyənləri və küknarda yaşayan digər qabıqyeyənlər uçmağa başlayırlar, sonra isə şam ağacında yaşayan qabıqyeyənlər uçur. Qabıqyeyənlərin hamısı çoxalma dövründə birliklər qururlar. Bəzi növlər monoqam birliklər, yəni bir erkək və bir dişidən ibarət olan birlik, qalanları isə poliqam birlik, yəni bir erkək və bir neçə dişidən ibarət olan birliklər yaradırlar (**Bo**ронцов, 1967).

Aparılan tədqiqatlara əsasən Abşeron rayonunda meyvə bağlarına ciddi zərərverən qabıqyeyən böcəklərin bir neçə növü və onların bioekologiyası haqda məlumat veririk.

1. *Scolytus rugulosus* (P.W.J. Mueller, 1818)- Qırışıqlı qabıqyeyən .

Qırışıqlı qabıqyeyən meyvə ağaclarına zərərverən qabıqyeyənlər içərisində ən geniş yayılmış və çoxsaylı növdür. Xüsusilə də meyvə ağacları geniş yayılmış olan ərazilərdə bu növə olduqca tez – tez rast gəlinir. Fatmeyi, Bülbülə və Hövsan kəndlərindəki meyvə bağlarında apardığımız müşahidələr zamanı məlum oldu ki, ilkin zərərvericilərlə yoluxan ağacları ot, alaq basır və bu da ağacın zəifləməsinə səbəb olur. Nəticədə qırışıqlı qabıqyeyənlər bu ağaclarda daha sürətlə məskunlaşa bilirlər.

Qırışıqlı qabıqyeyənlərdə uçuş və yumurtaqoyma təxminən bir ay çəkir. Yumurta mərhələsi təxminən 10-14 gün, sürfə mərhələsi 15-20 gün, pup mərhələsi isə 10-14 gün çəkir. Beləliklə, bir nəslin inkişaf tsikli 1,5-2 ay çəkir. Daha sonra isə əlavə qidalanma dövrü başlayır ki, bu da cinsiyyət sisteminin tam inkişafı üçün vacibdir. Bu dövr ağacın qabığı altda keçir.

Qışlamış sürfələr aprel ayında puplaşmağa başlayırlar. Şimal rayonlarında puplaşma aprelin əvvəllərində başlayır və mayın sonunadək davam edir (Самедов, 1963). Yetkin böcəklərə aprelin sonu və mayın əvvəli rast gəlinir. Onların kütləvi uçuşları may ayının əvvəli ya da ikinci yarısı və hətta iyunun əvvəllərinə təsadüf edə bilər. Yay vaxtı Bakı kəndləri və Masazır qəsəbəsindəki meyvə bağlarındakı zədələnmiş ağaclarda adətən eyni vaxtda həm pup, həm sürfə və həm də yetkin fərdə rast gəlinir. Puplaşma və yetkin fərdin əmələ gəlmə mərhələləri aydın seçilir. Bu dövrdə böcəklərin sayı nəzərəçarpacaq dərəcədə artır və bunların uçuş dəlikləri yaranır.

Bizim apardığımız müşahidələrin nəticəsində qırışıqlı qabıqyeyənin bir ildə iki generasiyası məlum olmuşdur. Bunlar yaz generasiyası və yay-payız generasiyası adlanırlar. Bu növ sürfə mərhələsində qışlayır. Hətta cənuba doğru getdikcə demək olar ki, bəzən yetkin fərdlər qışlayır. Cünki, yüksək temperaturda növün inkişafı payız aylarında belə davam edir (Самедов, 1963).




**Şəkil 2.** Qırışıqlı qabıqyeyənin alma ağacının budaqlarında açdığı yollar:
A, B – qabıqda; C, D – oduncaqda.

Abşeron ərazisindəki meyvə bağlarında apardığımız müşahidələrdən görünür ki, bu növ qabıq və oduncaqda sürfə və yetkin fərdlər üçün yollar açır və bununla da ağaca ciddi zədə vurur (Şəkil 2). Bu cür zədələrə müxtəlif meyvə ağaclarında da rast gəlinir.

Alma, gavalı, heyva, armud, alça, ərik, şaftalı, gilas kimi meyvə ağacları ciddi zərər görür və vaxtında tədbir görülmədikdə yoluxmuş ağaclar quru-

yaraq məhv olur. Bu növ hətta yabanı bitən alma, armud, zoğal ağaclarına da ziyan vura bilir.

Apardıgımız müşahidələr zamanı qırışıqlı qabıqyeyənə Abşeron ərazisində hətta üzüm tənəklərində də rast gəlindi. Bəzən bu növ sağlam ağaclara belə yoluxur. Yeni əkilmiş iki və üç illik ağaclar da qırışıqlı qabıqyeyən tərəfindən ciddi zərər görürlər.

2. *Scolytus amygdali* (Guerin-Meneville, 1874) - Badam qabıqyeyəni.

Badam qabıqyeyəni meyvə ağaclarının cavan budaqlarını və tumurcuqlarını gəmirərək bitkilərə ciddi ziyan vurur. Bu növ badam, alma, armud, gavalı, ərik, gilas, əzgil kimi faydalı meyvə ağacları üçün ciddi təhlükə hesab olunur. Belə ki, bu növlə yoluxma zamanı ağacların gövdə və budaqları güclü zədələnmə nəticəsində sürətlə quruyur (Добровольский, 1951). Cavan ağacların yoluxması zamanı isə inkişafdan qalma və bəzən də ağacın məhvi müşahidə olunur. Abşeron ərazisindəki meyvə bağlarında bitən badam, püstə, əzgil ağaclarında çox tez-tez müşahidə olunur.

3.*Scolytus mali* (Bechstein, 1805) - Alma qabıqyeyəni və ya böyük qabıqyeyən

Alma qabıqyeyəni çox geniş yayılmış və təhlükəli bir növdür. Dəniz səviyyəsindən 1300 m hündürlüyə qədər olan ərazilərdə rast gəlinir. Bakı kəndləri və Masazır qəsəbəsindəki meyvə bağlarında aparılan müşahidələr zamanı bu növə olduqca tez-tez rast gəlinmişdir.

Qışlamış sürfələrin puplaşması mayın birinci ongünlüyündə başlayir. Böcəklərin uçuşu isə mayın axırına təsadüf edir. Bəzən puplaşma aprel və may aylarına da təsadüf edə bilər. Həmçinin aprelin sonu və may ayında yeni böcəklərin çıxması da müşahidə olunur. Bu hadisə mayın ikinci ongünlüyündə daha da intensiv olur. İyul ayının ortalarından etibarən pupların sayının artması, uçuş dəliklərinin meydana çıxması və yetkin böcəklərin çıxması başlayır. Bu alma qabıqyeyəninin cənub bölgələrində bir ildə iki generasiyasının oldugunu ehtimal etməyə əsas verir (Крыжановский, 1974). Belə ki, əksər qabıqyeyənlərin bir ildə 1 və ya 2 nəsil verdikləri məlumdur. Bəzən birinci il alma qabıqyeyəninin sürfələri, böcəyə çevrilə bilmir, ağacın qabığı altında qışlayır və aşağı temperaturda donurlar. Qar örtüyünə görə onlar az zərər görürlər. Alma qabıqyeyəninin soyuğa davamlılığı onların qışlama xüsusiyyətləri ilə sıx bağlıdır. Belə ki, cavan böcəklər, sürfə və pup halında, ağac qabığı altında öz yuvalarında qışlayanlar, aşağı temperatura müxtəlif yanaşırlar. Həmçinin yüksək yay temperaturları da alma qabıqyeyəninin sürfə və pupları üçün öldürücü təsir göstərə bilər. Çox vaxt günəş şüalarının təsiri ilə, iyunda ağac qabığı altında alma qabıqyeyəninin inkişafına lazım olan istilik həddindən yuxarı qalxır ki, bu da onların sürfələrinin məhvinə səbəb olur.

Sürfələr inkişaflarının orta və ya son mərhələlərində qışlayırlar. Alma, heyva, gavalı, armud, ərik, şaftalı kimi təsərrüfat əhəmiyyətli ağaclara ciddi ziyan vurur. Hətta yabanı halda bitən cır alma, armud və alçaya da zərər verir. Zoğal ağacında da bu növlə yoluxma halları müşahidə olunur. Ən böyük zərəri isə alma və gavalı ağaclarına verir. Alma qabıqyeyəni əsasən gövdə və qalın budaqların qabıq və oduncağında iri yollar açır. Müqayisa üçün qeyd edək ki, qırışıqlı qabıqyeyən eyni ağacın daha nazik budaqlarında məskunlaşırdı (Самедов, 1963).

Bu növ tərəfindən vurulan ziyanın miqyası olduqca böyükdür. Masazır qəsəbəsindəki meyvə bağlarında olarkən müşahidə etdik ki, hər hansı bir səbəbdən zədələnmiş istənilən ağac qırışıqlı qabıqyeyən və alma qabıqyeyəninə yoluxur və bununla da məhv olur. Bu səbəblərdən biri kimi Masazır qəsəbəsində müşahidə olunan quraqlığı göstərmək olar. Belə ki, quraqlıq səbəbindın zəifləmiş ağaclara hücum edən böcəklər orada asanlıqla məskunlaşırlar və ağac qabığı və oduncağını zədələyərək ağacın tamamilə məhv olmasına şərait yaradırlar. Bizim əldə etdiyimiz məlumatlar alma qabıqyeyəninin fəaliyyətini və vurduğu ziyanın miqyasını qiymətləndirmək üçün çox azdır. Lakin apardığımız müşahidələrdən o nəticəyə gəlmək olur ki, istənilən bağ və ya meşəlik ərazidə olan zədələnmiş ağac alma qabıqyeyəninə asanlıqla yoluxur və qabıqyeyən tərəfindən oduncağı ciddi zədələnərək quruyub məhv olur.

Abşeron ərazisində alma qabıqyeyəniylə yoluxma hallarına tez-tez rast gəlinir. Meyvə bağları ciddi ziyan görür. Fərdi və ya təsərrüfat əhəmiyyətli bağlarda məhsuldarlıq nəzərəçarpacaq dərəcədə aşağı düşür. Bəzən isə nəzarətdən kənar qalmış ərazilərdə kütləvi yoluxma zamanı meyvə bağlarının kütləvi quruyaraq məhvinə səbəb olur.

4. *Hylesinus toranio* (D'Anthoine, 1788) - Zeytun qabıqyeyəni.

Zeytun ağacı Abşeron ərazisi üçün olduqca xarakterik bir bitkidir. Bu bitkidən bölgədə aparılan yaşıllaşdırma və torpaq bərkitmə işlərində geniş miqyasda istifadə edilir. Həmçinin zeytun bitkisi böyük təsərrüfat əhəmiyyətinə malikdir. Belə ki, bu bitkinin meyvələrindən tibdə dərman preparatlarının hazırlanmasında və sənayedə yağ alınması üçün istifadə olunur.

Abşeron rayonunun mövcud iqlim şərtləri zeytun bitkisi üçün olduqca əlverişlidir. Bu səbəbdəndir ki, Abşeron rayonu ərazisindəki park və yaşıllıqlarda və həmçinin fərdi meyvə bağlarında bu bitkiyə tez-tez rast gəlirik. Bakı kəndlərində fərdi bağlarla yanaşı təsərrüfat əhəmiyyətli böyük zeytun bağları da mövcuddur ki, bu bağların ərazisi yüz hektarlarla ölçülür. Lakin bu qiymətli bitki də, qabıqyeyənlərin hücumuna məruz qalır. Abşeron rayonu ərazisində apardığımız müşahidələr zamanı

qabıqyeyən böcəklərin hücumuna məruz qalmış çoxlu sayda zeytun ağacları müşahidə etdik.

Zeytun qabıqyeyəninə demək olar ki, bütün meyvə bağlarında və meşə sahələrində rast gəlinir. Bu növ zeytun təsərrüfatları üçün ciddi təhlükə hesab olunur. Hətta yabanı halda bitən zeytun və iydə ağaclarını belə zədələyir (Добровольский, 1951). Bu növün zeytun agaclarına ciddi zərəri məlumdur. Zeytun qabıqyeyəni də sürfə mərhələsində qışlayır. Yetkin fərdlərin uçuşu digər qabıqyeyənlərlə müqayisədə bir az gec baş verir. Böcəklərin kütləvi uçuşu iyun ayına təsadüf edir. Bu zaman istər zeytun bağları və istərsə də pərakəndə halda bitən zeytun və iydə ağacları ciddi zərər görür. Böcəklər ağacların qabığı altında və oduncağında yaşayırlar və burada öz həyat fəaliyyətləri üçün zəruri olan yollar açırlar ki, bunun da nəticəsində ağacın yuxarı hissəsini ağacın kökü ilə əlaqələndirən yollar zədələnir. Bu zaman zeytun ağaclarının çətir hissəsi zəifləməyə və qurumağa başlayır. Vaxtında müdaxilə olunmadıqda ağac tamamilə quruyur və məhv olur.

Zeytun qabıqyeyəninə sağlam ağaclarda demək olar ki, rast gəlinmir. Bu böcəklər hər hansı bir səbəbdən zəifləmiş ağaclarda çox asanlıqla məskunlaşırlar. Məlumdur ki, Abşeron rayonu ərazisində daima güclü küləklər müşahidə olunur və əksər hallarda bu küləklər ərazidəki bitkilərə ciddi ziyan vurur. Bu zaman zədələnmiş zeytun ağaclarına qabıqyeyən böcəklər hücum edirlər və ağacın zədələnmiş hissəsindən asanlıqla qabıqaltına və gövdəyə yollar açırlar.

Abşeronda xeyli sayda zeytun təsərrüfatları mövcud olduğuna görə burada zeytun qabıqyeyəni daha intensiv müşahidə olunur. "Zeytunluq" adlanan ərazidəki müşahidələr zamanı məlum oldu ki, zeytun qabıqyeyəni buradakı əksər zeytun ağaclarının gövdəsini zədələyir və beləliklə ağacın qidalanmasını pozaraq qurumasına səbəb olur.

5. *Hypoborus ficus* (Erichson, 1836)-Əncir qabıqyeyəni.

Əncir bitkisi Abşeron ərazisi üçün olduqca xarakterikdir. Belə ki, bu ərazidəki meyvə bağlarında bu bitkiyə çox tez-tez rast gəlinir. Əncir ağacı da hər il külli miqdarda qabıqyeyən böcəklərin hücumuna məruz qalır. Ona görə də bu bitkiyə qabıqyeyən böcəklər tərəfindən vurulan zərərin qarşısının alınması vacibdir.

Əncir qabıqyeyəni əncir ağacının gövdə və budaqlarını ciddi zədələyir. Hətta müşahidələr zamanı bu qabıqyeyənə tut ağacı və üzüm tənəklərində belə rast gəlinmişdir. Xüsusilə zədələnmiş və zəifləmiş ağaclara hücum edən böcəklər bitkinin tamamilə məhvinə səbəb olur. İldə iki, bəzən hətta üç nəsil verir. Eyni zamanda əncir qabıqyeyəni Phomopsis cinerascens – adlanan göbələyin sporlarının daşıyıcısıdır ki, bu da "əncir xərçəngi" adlanan xəstəliyə səbəb olur və bitkini məhvə aparır.

Beləliklə, bu məqalədə Abşeron ərazisindəki stasionar məntəqələrimizdə (Masazır və Hövsan qəsəbələri və Bakı kəndləri) apardığımız müşahidələr zamanı çox tez-tez rast gəlinən qabıqyeyən böcəklərin bir neçə növü və onların bioekologiyası haqda məlumat veririk. Hansı ki, bu qabıqyeyən böcəklər bitkilər üçün olduqca təhlükəlidir. Yuxarıda da qeyd etdiyimiz kimi ağacların qabıq və oduncaq toxumalarıyla qidalanan bu böcəklər burada özlərinə yollar açırlar. Bunun nəticəsində isə ağac toxuması hüceyrələrinin bir-biriylə əlaqəsi kəsilir və toxuma ciddi zədələnir. Gövdə hissəsindən zədələnmiş ağacın yuxarı hissəsinin su və mineral maddələrlə təminatı kəsilir və ya zəifləyir. Beləliklə də, ağac qismən və ya tamamilə quruyur. Vaxtında tədbir görülmədikdə bu zərərvericilərin hücumu nəticəsində çox böyük hektarlarla yaşıllıq ərazilər məhv olma təhlükəsiylə üzləşir. Məhz bu səbəblərdəndir ki, bu sahədə geniş mübarizə tədbirlərinin aparılması tələb olunur.

## ƏDƏBİYYAT


**Əliyev S.V.** (2004) Sərtqanadlılar və ya böcəklər dəstəsi. *Azərbaycan heyvanlar Aləmi,* **II cild**, Bakı: Elm, 158-160 s.

**Məmmədov Z.M., Atayeva R.S., Muradova E. M.** (2014) Şəki-Zaqatala bölgəsində meyvə və meşə ağaclarına zərərverən qabıqyeyən böcəklər. (*Coleoptera, Ipidae*). *Zoologiya institutunun əsərləri,* **32(№ 2):** 134 -139.

**Добровольский Б.В.** (1951) Вредные жуки. Ростов-на-Дону: Ростиздат, 437 с.

**Воронцов А.И.** (1967) Лесная энтомология. Москва. Высшая школа: 399 с.

**Крыжановский О.Л.** (1974) Жесткокрылые. / Насекомые и клещи - вредители сельскохозяйственных культур. **Том 2.** Л.: Наука, 336 с.

**Определитель насекомых европейской части СССР** (1965) **Том 2:** Жесткокрылые (*Coleoptera*) и веерокрылые. М.-Л.: Наука, 668 с.

**Самедов Н.Г.** (1963) Фауна и биология жуков, вредящих сельскохозяйственным культурам в Азербайджане. Баку: АН Азерб. ССР, 384 с.

## Жуки-Короеды (*Coleoptera, Ipidae*) Фруктовых Садов Абшерона И Их Фенологические Особенности

**К.Б. Исаева**

*Институт зоологии НАНА*

В статье впервые представлен материал о фенологических особенностях и о хозяйственном значении 5 видов короедов, вредителей фруктовых деревьев Абшерона. Эти насекомые являются серьезной угрозой для фруктовых, виноградных и оливковых деревьев Абшерона. Они повреждают стволы деревьев, в результате чего деревья высыхают и полностью уничтожаются.

***Ключевые слова:*** *Coleoptera, Ipidae, короеды, Абшерон, личинка, куколка*

## The Bark Beetles (*Coleoptera, Ipidae*) Of Absheron Gardens And Their Phonological Features

**K.B. Isaeva**

*Institute of Zoology, ANAS*

For the first time data on the phonological characteristics and economic importance of the 5 species of bark beetles, pests of fruit trees of Absheron have been presented. These insects are a serious threat to fruit, grape and olive trees of Absheron. They damage the trunks of trees, resulting in drying and complete destroying of the trees.

***Key words:*** *Coleoptera, Ipidae, bark beetles, Absheron, larva, pupa*